© *“Metafizika” Journal* *p-ISSN 2616-6879*
*Vol 6, issue 4, serial 24, 2023. pp.206-215* *e-ISSN 2617-751X*

**UOT:** 1 (091).
**KBT:** 87.3(4\8)
**MJ №** 196

# Qərbi Avropa personalizminin fəlsəfi təhlili

**Ruslan Xəlilov***

**Abstrakt.** İndividualizm və xüsusilə personalizm filosof-mütəfəkkirlərin diqqətini xüsusilə cəlb edən məsələlər sırasında olublar. İnsanın cəmiyyət ilə münasibətlərində öz xüsusiyyətləri, özgürlüyü və təkrar olunmazlığını qoruyub saxlamasını ifadə edən bu problemi müəyyən etməyin əhəmiyyətindən danışsaq, konkret bir şəxsə məxsus göstəricilərdən çıxış etməklə bütöv və hərtərəfli nəticə əldə etmək mümkündür. Qeyd olunan vəzifəni həyata keçirmək o qədər də asan deyildir. Çünki söhbət müəyyən bir şəxsi başqalarından ayırmaqdan başlayaraq, onun unikallığının formalaşması və mövcudluğunun müəyyən olunmasına qədər davam edən bir prosesi öyrənməkdən gedir. Dünyaya fərd kimi gələn insan öz fəaliyyəti, özünüdərketməsi sayəsində şəxsiyyətin qabil ola biləcəyi bir varlığa çevrilə bilər. Məhz cəmiyyətin normal fəaliyyəti və inkişafı üçün onun hər bir üzvünün müəyyən qədər özünəməxsusluğu zəruridir. Və cəmiyyət üzvlərinin rəngarəngliyi, burada aydın ifadə olunmuş fərdiyyətlər, şəxsiyyətlərin mövcudluğu hər bir ictimai quruluşun, onun mədəniyyətinin həqiqi zənginliyini təmin edir. Buna görə də, insanların fərdi özünəməxsusluğuna malik olması sosial inkişafın qanunauyğunluğu kimi də qəbul edilir. Məqalədə Avropa personalistlərinin fikirlərinə istinadən belə proseslər izlənilib.

**Açar sözlər:** insan və sivilizasiya, individualizm, personalizm, Munye və Avropa personalizmi

## 1.Giriş

İnsan problemi bütün fəlsəfə üçün ən əhəmiyyətli məsələ olub, tarixin inkişafının dönüş mərhələsində xüsusi aktuallıq kəsb edir. Bu problem nəinki ayrıca fərdin, həm də bütün cəmiyyətin mövcudluğunun mənası və məqsədləri baxımından həmişə daha kəskin məsələ kimi səciyyələndirilir. Antik dövrün müdriklərindən biri çox dəqiq və obrazlı şəkildə demişdir: “İnsan üçün insanın özündən maraqlı obyekt yoxdur”. Təsadüfi deyil ki, Protaqor insanı “bütün şeylərin ölçüsü” adlandırırdı. Bəs insan anlayışının mahiyyətində dayanan personalizm nədir?

* Xəzər Universitetinin “Fəlsəfə tarixi” ixtisasının doktorantı,
Xəzər Universitetində müəllim; Bakı, Azərbaycan
E-mail: ruslan.khalilov@khazar.org
https://orcid.org/0009-0007-5394-0740

**Məqaləyə istinad:** Xəlilov, R. [2023] Qərbi Avropa personalizminin fəlsəfi təhlili. *“Metafizika” jurnalı, 6(4),* səh.206-215.

**Məqalənin tarixçəsi:**
*Məqalə redaksiyaya daxil olmuşdur: 27.11.2023*
*Təkrar işlənməyə göndərilmişdir: 04.12.2023*
*Çapa qəbul edilmişdir: 11.12.2023*

Fərd insanın bölünməz, dəyişməz əsasını səciyyələndirirsə, Avropa personalistlərinə görə, personalizm, əksinə, insanın sosial-mədəni mühitin təsiri altında inkişafının göstəricisi kimi çıxış edir. Məsələn, “*Munyeyə görə yeni humanizm idealında şəxsin bütün meyarları, ilk öncə isə, onun digər insanlar ilə qırılmaz və zəruri bağlılıqları və həmçinin sosial-mədəni mühitin təsiri nəzərə alınmalı idi*” [Кузнецов, 1970, s.219]. Buna görə də, bəzən deyirlər ki, fərd bütövlük, bölünməzlik olduğu halda, personalizm məfhumu ikiləşə bilər, bölünə bilər. Yəni, insanın şəxsiyyəti bir yox, ardıcıl olaraq və ya eyni zamanda bir neçə mühitin təsirinə məruz qala bilər ki, bu da onun bütövlüyündə və tamlığında bir iz buraxa bilər. Bütün bu deyilənləri nəzərə alaraq, Avropa personalizmində qeyd olunurdu ki, insanın təşəkkülünə ən çox təsir göstərən amil sosial mühitdir. Yuxarıda qeyd olunanlardan həmçinin aydın olur ki, personalizm sosial dinamikaya, cəmiyyətdə insanlar arasında sıx əlaqələrin qurulmasına yönəli bir təlimdir. Çünki, şəxsiyyətin təşəkkülündə onun formalaşması prosesində əksər hallarda bir-birinə zidd olan, bir-birini inkar edən prinsiplər toqquşur və bu həmin şəxsə öz təsirini göstərir. Bununla əlaqədar hər bir insanın şəxsiyyəti dəyişkən, çoxnövlüdür və həyat şəraitindən asılı olaraq özünü müxtəlif cür ifadə edir. Personalizmə görə, cəmiyyətlərdə humanizmin, yəni, yüksək insani dəyərlər ilə idarə olunmanın gerçəkləşməsi üçün praktik addımlar atılmalı, həmçinin ilk öncə şəxslərin cəmiyyətə açıq və cəmiyyətin inkişafında fədakar olmaları əsas şərt kimi qəbul edilməlidir. Həmçinin, cəmiyyətin də, eyni dərəcədə şəxslərdə bu kimi keyfiyyətləri təşviq etməsi də məsələnin ikinci tərəfini təşkil edən vacib məqam olmalıdır. Şəxsiyyət sadəcə olaraq konkret tarixi ictimai münasibətlərin daşıyıcısı demək deyildir, o öz fərdi qabiliyyət və istəyinə, şüurluluğuna və mütəşəkkilliyinə, əmək və ictimai-siyasi fəallığına müvafiq surətdə həmən münasibətlərə aktiv təsir göstərən adamdır. Hər bir fərd öz ictimai əlaqələrində və davranışında şəxsiyyət kimi çıxış edə bilməz. Bəzən şəxsiyyət anlayışında sosial tərəfin əsas yer tutması faktından belə bir yanlış nəticə çıxarırlar ki, fərdi şəxsiyyət hesab etmək üçün o müəyyən subyektin qiymətləndirici tələblərini ödəməlidir. Xeyr, personalizm birtərəfli inkişaf deyil, ümumi inkişafdır.

Personalizm XX əsrin ortalarındakı çətin dönəmdə şəxs, cəmiyyət və dövlət arasında həmahəng bağlılığı təmin etməyə çalışan bir təlim idi. Başqa sözlə desək, şəxsin konstruktiv rolunu önə çəkən fikir axını olaraq fəaliyyət göstərirdi.

**2.Qərbi Avropada personalizm anlayışının fəlsəfi təhlili**

Personalizmin bir cərəyan kimi meydana gəlməsi XIX əsrin sonu - XX əsrin əvvəllərinə təsadüf edir. “*Bütün müasir fəlsəfi cərəyanlar kimi, personalizm də, XIX əsrin sonlarında Avropa mədəniyyətinin qlobal böhranına qarşı müəyyən cavab reaksiyası idi... Böhranı aradan qaldırmaq*

*üçün dünya ilə mücadiləyə girmək, yaratmaq, sıçrayışlar etmək lazım idi*" [Соловьева, 2012, s.242]. Yəni personalizm öz dövrünə qarşı müəyyn bir cavab reaksiyasıdır, bir yanaşma tərzidir. Müəyyən mənada mədəni mübarizə formasıdır. Dövrün çağırışlarına qarşı passivlik nümayiş etdirən fərdi yox, artıq gerçəkləşmiş və mübarizəyə qoşulmaq iqtidarında olan formalaşmış şəxsiyyəti dəstəkləyən fəlsəfi fikir axınıdır. Personalizm fəlsəfi cərəyan və ya məktəbdən daha ziyadə, dəyişən şərtlərdə mənəvi dəyərlər, din, tarixilik fonunda şəxsiyyətin formalaşdırılmasını qarşısına əsas məqsəd qoyan fəlsəfi fikir axınıdır. Başqa sözlə desək, "*personalist üçün ən vacib amil fərdin taleyi ideyasını dünyəvilik kontekstində nəzəri cəhətdən əsaslandırmaq yox, bu gün və indi şəxsiyyət kimi yaşamağa başlamaq, şəraitin şəxsin fəaliyyətinə maneə törətməsinə baxmayaraq şəxsiyyət olaraq qalmaqdır*" [Соловьева, 2012, s.247]. Yəni XX əsrin daha çox fərdiyyət probleminə köklənən individualizm və müəyyən mənada da, ekzistensializmdən fərqli olaraq, personalizm daha mücadiləçi və mübariz təlimdir. İnsan və onun qüvvəsinə daha çox inanma bəsləyən fikir istiqamətidir. Bu mənada o da qeyd olunmalıdır ki, "*personalizmin ən qatı düşməni individualizmd*ir" [Соловьева, 2012, s.248]. Çünki, individualizm insanın daha çox özünə qapanması, daha çox özünə istinad etməsidir. İndividualizm cəmiyyətdə baş verən hadisələrə qarşı aktivlik nümayiş etdirməyi düşünmür və bu proseslərdə daha çox özünəməxsusluğunu qorumağa çalışır. Tarixi keçmişə nəzər salsaq, bəzi dinlərdə də bu mövzuya toxunulmuşdur. Məsələn, personalizm və individualizm arasındakı mübarizə xristian ilahiyyatında da, daima əsas mübahisə mövzularından biri olmuşdur. Böyük xristian teoloqu Avqustin Avreli (354-430) də, bu məsələyə xüsusi diqqət yetirmişdir. "*Mənəviyyatın mərkəzində Məsihin durduğunu iddia edən Avqustin də personalizm vasitəsi ilə, istənilən individualizmə qarşı meydan oxuyurdu*" [Martin, 2003, s.159]. Personalizm şəxsiyyəti formalaşdırmaq, onun yaradıcı gücünü açmaq məqsədi güdür. Əsasən bu kontekstən də şəxsiyyətə xitab edir. Çünki, fərd insanın bölünməz, dəyişməz əsasıdır, şəxsiyyət isə əksinə insanın mədəni mühitinin təsiri altında dəyişə bilir. Yuxarıda qeyd etdiyimiz kimi, XX əsrin tarixi prosesləri, qısa zaman kəsiyində baş verən dünya müharibələri də personalizm kimi fikir, düşüncə axınının formalaşmasına təsirsiz ötüşməmişdir. Personalizm məhz belə bir ziddiyyətli dönəmdə törəyərək meydana gəlmişdir.

Digər bir istiqamətdən yanaşsaq, "personalizm fərqlilikləri tanımaq, eyni zamanda da, bərabərlik məsələsinə münasibətdə, pozitiv iddiaları dəstəkləmək adına bir üsul təqdim etməyə çalışır" [Grant, 1996, s.173]. Yəni personalizmin mahiyyətində ümumilik var. O, bərabərlik ideyasını əsas qayə kimi təyin edir. Eləcə də inkişafa yön verən bütün müsbət cəhətləri də alqışlayır.

Personalizm sadəcə olaraq konkret tarixi ictimai münasibətlərin daşıyıcısı demək deyildir, o öz fərdi qabiliyyət və istəyinə, şüurluluğuna və mütəşəkkilliyinə, əmək və ictimai-siyasi fəallığına müvafiq surətdə həmən münasibətlərə aktiv təsir göstərən bir məfhumdur. Başqa sözlə desək, “personalizm azad və yaradıcı şəxslərin mövcudluğunu nəzərdə tutur ki, bu da sərt sistemləşmədən imtina etməyə imkan verəcəkdir [История..., 1998, s.142]. Yəni personalizm, kapitalizm dövründə səthiləşən və itən dəyərləri, insan-şəxsiyyət probleminə müraciət edərək yenidən bərpa etməyə çalışır. Sxematik və şablonlaşmış həyat ritmlərini insana, onun şəxsiyyətinə dönüş etməklə yenidən qaytarmağa cəhd edir. İnsanı yaradıcı və öz maraqlarını reallaşdıran bir varlıq kimi görmək istəyir. Təsadüfi deyildir ki, XX əsrdə Qərbi Avropada personalizm ideyasının yaradıcısı olan “Emmanuel Munyenin (1905-1950) fikrincə də, personalizm yalnız reallığın həqiqi şərhini izah edən deyil, həm də praktiki əhəmiyyət kəsb edən və praktikliyi təmin edən yeganə konsepsiyadır [История..., 1998, s.144]. Yəni, personalizm çətin və ziddiyyətli məqamlardan çıxmaq üçün praktik və praqmatiklik təbliğ edir. İnsanda bu xüsusiyyətləri aşılamağa və onu bu xüsusiyyətlərə sahib olmağa səsləyir. İnsan bu xüsusiyyətlərə yalnız sosiallaşma mühitində nail ola bilir. Ona görə ki, “*personalizmin can atdığı sivilizasiya “sosial” sivilizasiyasıdır*” [История..., 1998, s.145]. Buna görə də, personalizm anlayışının daxili məzmununu açarkən ilk növbədə onun sosial həyatda əks olunan, ümuməhəmiyyət kəsb edən, hamı tərəfindən qəbul olunan və obyektiv xarakter daşıyan göstəriciləri nəzərə alınmalıdır. Yəni gerçək mənada, sözün tam anlamında sosial sivilizasiya nəzərdə tutulur. Sosial sivilizasiya görüntüsü yaradan, mahiyyətdə isə istismarçı cəmiyyət yox (məsələn, istismarçı və dəyərləri məhv edən kapitalizm kimi).

Personalizm probleminə cəmiyyət daxili münasibətlər konteksindən yanaşsaq, “*şəxsiyyət həmişə dialoqa yönəlib və personalizmin məqsədi olan sosial sivilizasiya fərdiliyi də qoruyub saxlayır*” [История..., 1998, s.147]. Məsələn, görkəmli Amerika psixoloqu və sosioloqu Çarlz Kuli uzunmüddətli tədqiqatlar sayəsində şəxsi mənlik konsepsiyasını işləyib hazırlamışdır. Ç.Kuli iddia edir ki, “*hər bir şəxs əlaqədə olduğu digər adamların reaksiyalarını dərk etməyə əsaslanaraq öz mənliyini yaradır*” [Abbasova, Hacıyev, 2001, s.303]. O belə qənaətə gəlir ki, şəxsiyyətin mənliyi yalnız obyektiv amillərə şərtlənir. Məhz, başqaları ilə münasibətdə, digər adamların verdiyi qiymət əsasında insan özünün ağıllı və ya ağılsız, cəzbedici və ya çirkin, qabiliyyətli və ya səviyyəsiz olduğunu təsdiqləyir. Başqalarının reaksiyası vasitəsilə üzə çıxan insan mənliyi Çarlz Kuli tərəfindən “güzgülü mənlik” kimi əsaslandırıldı və “sosial güzgü konsepsiyası” kimi məşhurlaşdı. Yəni insan özünü dialoqda gerçəkləşdirir, fikirlərini bölüşür, fikir və düşüncələrinə qarşı reaksiya görür. Bu mənada personalizm insanın

gerçəkləşmə məkanı kimi mümkün qədər çox sosiallaşmanı görür. Sosial sivilizasiya da bu mənada fərdlərə daha çox reallaşma, yəni öz imkanlarını açma imkanı verir.

Avropa personalizminin əsas qollarından, daha doğrusu fikir istiqamətlərindən biri də əxlaqi personalizmdir. Əxlaqi personalizm Maks Şeler (1874-1928) tərəfindən əsaslandırılmışdır. Burada "şəxs" ilkin olaraq insana deyil, Tanrıya şamil edilmişdir. Tanrı ideyasını ilk şəxs olaraq qəbul edən M.Şeler insanı dualist şəkildə müəyyənləşdirir, çünki o, təkcə Tanrının deyil, həm də təbiətin övladıdır. Ona görə də, insan özündən Tanrıya deyil, Tanrıdan insana keçid etmək lazımdır" [История..., 1998, s.350]. Yəni, M.Şelerə görə, şəxs anlayışı ilkin olaraq Tanrını ifadə edən bir anlayış olduğundan, ilk öncə təbiətin övladı olan insan, özünü şəxs adlandırdıqda ilk şəxsə ehtiramı da unutmamışdır. İnsanın özünü şəxs olaraq dərk etməsi, ilk şəxs olan Tanrı ilə qiyaslanaraq törəmişdir. İnsan özünü şəxs kimi, Tanrını şəxs olaraq dərk etdikdən sonra tanımışdır. Deməli, şəxs ideyasının kökü insandan öncə Tanrıya xitabətdən meydana gəlmişdir. Təbiətdə öz yerini tutduqdan sonra insan da, şəxs olmağa çalışmışdır. Ümumiyyətlə, Avropa personalizminin din ilə bağlılığı Amerika personalizmindən daha çoxdur.

Avropadan Amerikaya da miqrasiya edən personalizm burada da fərqli istiqamətlərə ayrılmış oldu. Belə istiqamətlərdən biri də Meksikada fəaliyyət göstərən ispan personalist filosofu Xose Qaos (1900-1969) tərəfindən inkişaf etdirilən proqresiv personalizmdir. "*O, ilk öncə, "personalistin" real fəaliyyətinə qarşı dissonant* (*harmoniyanı, birliyi pozmaq, zidd olmaq mənasında* - *R.X.*) *münasibətdə idi, ikincisi, X.Qaos bir növ onun üçün arxetip qismində olmaqla, düşüncənin daha geniş tarixi kontekstinə baş vururdu*" [История..., 1998, s.256]. Yəni Xose Qaos personalizmi daha dərin mənada başa düşürdü. Ona görə də, amerikalı filosof dar mənalı personalizm və personalist anlayışana qarşı çıxırdı. O hesab edirdi ki, personalizm göründüyündən daha dərin və geniş mənaya malikdir. Burada tək bir Qərb mədəniyyəti yox, digər mədəniyyətlərin də təsirləri nəzərə alınmalıdır. Bu cəhətdən o, personalizmi İber-Amerika mədəniyyəti kontekstində daha əhatəli şəkildə başa düşürdü. Şəxsiyyətin formalaşmasına fərqli mədəniyyətlərin təsir etməsinin həlledici olduğunu göstərməyə çalışırdı. Məlumdur ki, Avropa personalistləri bu cəhətdən daha konservativ idilər və personalizmin bazası kimi, təkcə Avropa mədəniyyətini götürməyə çalışırdılar.

XX əsr fransız fəlsəfəsinin görkəmli nümayəndələrindən biri olan "*Pol Rikour (1913-2005) personalizmə şəxsiyyətin universal inkişafına müraciət edilərək müxtəlif konsepsiyalar formalaşdırmaq gücündə olan "fəlsəfi nüvə" kimi baxırdı*" [Вдовина, 1990, s.16]. Digər bir fransız personalist filosof "*Jan Lakruaya (1900-1986) görə isə, personalizm heç bir dinin və hər hansı*

*bir sinfin müdafiəçisi kimi çıxış etmir*” [Вдовина, 1990, s.20]. Ümumilikdə personalizm əsasən xristian teologiyasından çıxış etsə də, J.Lakruaya görə personalizm bir ideya olaraq neytrallığı dəstəkləyir. Həmçinin, onu da qeyd edək ki, personalizm sivilizasiya layihəsinin nəzəri inkişafı, ümumi planetar və ümumi humanist dünyagörüşüdür. Burada insan və onun universal inkişafı əsas hədəfdir. Bu dünyagörüşün əsasını həm dini, həm də, qeyri-dini, yəni, fəlsəfi və sosial-fəlsəfi konsepsiyalarda işlənmiş bütün üstün elementləri əhatə etməklə modernləşdirilmiş xristianlıq təşkil edir.

Ümumiyyətlə, fransız personalizmi insanın real dünyanı dərk etmək və humanistləşdirmək üçün praktik fəaliyyətlə məşğul olması mövzusu ilə paralel şəkildə, müasir Qərb fəlsəfəsi üçün çox aktual olan fərdin daxili dünyası problemini də inkişaf etdirdi. Buna görə personalizm sonda fərdin mənəvi aləminin zənginləşməsi, onun daxili dünyasının xarici aləmə düzgün açılmasını təmin etməyə çalışırdı. Personalizm totalitarizmə qarşı, şəxsiyyəti, fərdiliyi qorumaq, onu əzməyə çalışan strukturlara əks olaraq meydana gəldi. Yəni personalizmin doğuluşunu təşviq edən məqamlardan ən əsası, XX əsrdə meydana gələn totalitar (faşizm, kommunizm) təlimlər olmuşdur. Belə tarixi şərtlərdə personalizmin insan-şəxsiyyət mərkəzli baxışları formalaşdı.

**3.Munye və personalizm**

Emmanuel Munye (1905-1950) fransız personalizminin banisi və ən böyük nümayəndəsidir. 1946-cı ildə çap etdirdiyi “*Personalizm nədir?*” əsərində personalizm problemini ətraflı şərh etmişdir. İlk növbədə, E.Munyeyə görə, “*personalizm nəinki siyasi sistem deyil, ümumiyyətlə sistem də deyil*” [Мунье, 1994, s.49]. Yəni Munye həmin dövrdə mövcud olan fəlsəfi nəzəriyyələrdən (ekzistensializm, marksizm və s.) fərqli olaraq personalizmi fəlsəfi cəhətdən təlimləşdirmək, məktəb yaratmaq və ya siyasi kursa çevirmək məqsədi güdmürdü. O personalizmi bir fikir axını, mənəvi yaraların müalicəsi, dövrün şərtlərini qınaq aləti kimi nəzərdən keçirirdi. Fikirdə təkmilləşmə, düşüncədə və əxlaqda kamilləşmə yolu kimi baxırdı (həmin dövrdə Avropadakı ictimai-siyasi vəziyyəti dəyərləndirsək, onun fikrini daha aydın başa düşmək olar). Həmçinin, Munye personalizm dedikdə təcrid olunmuş individi, fərdi yox, öz təbiətinə xas olaraq həyatın kollektiv formaları ilə sıx bağlı olan insanı nəzərdə tuturdu. Çünki, Munyenin insanı passiv varlıq deyil, nələrisə dəyişmək gücünə malik varlıqdır. O, fərdilikdə/fərdiliyində statik olaraq mövcud olan insan yox, dinamik varlıqdır. İnsana daxilən fəaliyyət və hərəkət xas olduğu kimi, Munye də bu təbii halından istifadə etməyi, onları məqsədyönlü şəkildə yönəltməyi bacaran insanı önə çəkirdi.

Digər bir yanaşmasında Munye yazır ki, “personalizm bütün ideya mübarizəsi aparan tərəfləri böyük bir ailədə birləşdirməyə çalışır [Мунье, 1994, s.89]. Yəni Münyeyə görə personalizm bir istiqamətli, tək qütblü təlim

deyil. Buna görə də o, bütün fikir axınları və təlimlərin ideyalarını vahid mərkəzdə birləşdirməyin mümkün olmasına inanır.Həmçinin bu zaman onlar arasında müəyyən güzəştlərin əldə olunmasını da hədəfləyirdi. Onlar arasında dialoq qurmağı qarşısına hədəf qoyurdu. Bəs bu ideyanın reallaşması nə dərəcədə real ola bilərdi?Düşünürük ki, XX əsrin şərtlərini və totalitar antoqonist tərəflər arasındakı münaqişələri nəzərə aldıqda bu iş olduqca çətin görünürdü, lakin Münye bunu bacaracağını düşünürdü.

Digərlərindən fərqli olaraq, Munye düşünürdü ki, personalizm gələcəyə sonu bilinməyən bir səfərdir. Amerika personalizmindən fərqli olaraq Avropa, xüsusən də fransız personalizmi daha çox fərziyyə və utopik xarakterli idi. Amerikan personalizmi isə daha çox praqmatikliyə əsaslanırdı. Aşağıda qeyd olunan fikrindən də bunu aydın görmək olar:

"*Eyni anda layihə, üsul və tələb olan personalizmi sistemə çevrilmə cəhdi, onun müəyyənliyini itirə bilər*" [Мунье, 1994, s.112]. Yəni Avropa personalizminə görə (Munyeyə görə) personalizmin tələbləri və təklifləri açıqdır, praktikidir. O nəzəriyyəyə çevrildikdə, o bir standarta çevrilə bilər və bu zaman tələb və şərtlərin ödənməsi çətinləşəcək. Həmçinin, Munyenin yeni humanizm idealında şəxsin bütün meyarları, ilk öncə isə, onun digər insanlar ilə qırılmaz və zəruri bağlılıqları nəzərə alınmalı idi.

**3.Nəticə**

"Personalizm" anlayışı sözün geniş mənasında "sima, insanın bu və ya digər əməlləri, hərəkətləri, qərarlarının davranışlar vasitəsilə təzahürü" deməkdir. Personalizm ilk növbədə insanın şüuru və iradəsi ilə bağlı olan bir keyfiyyətdir. O, insanın nə isə bir daxili əsası, onun nüvəsi, demək olar ki, "Mən"idir. Bəs yekun olaraq personalizmin əsas cəhətləri, onun mahiyyətinin ifadə vasitələri hansılardır? Birincisi, konkret insanın bioloji cəhətdən şərtləndirilmiş xassələri və onun psixoloji xüsusiyyətləridir. İkincisi insanın inkişaf və təcrübə səviyyəsidir və nəhayət, insanın müəyyən cəmiyyətdə təlim-tərbiyə alarkən, konkret mədəniyyətin təsiri altında qazandığı keyfiyyətlərdir. Nəticə olaraq qeyd etmək lazımdır ki, personalizmin təşəkkülünə və inkişafına daha çox təsir göstərən məhz axırda göstərdiyimiz sosial amillərdir. İnsana bu və ya digər biliklərin verilməsi, onda müəyyən ideaların, arzuların tərbiyə edilməsi, maraq və tələbatın, əxlaqi və estetik keyfiyyətlərin, dünyagörüşünün formalaşdırılması-insan şəxsiyyətinin, personalizmin əsas tərkib hissələridir.

## ƏDƏBİYYAT

1. Abbasova, Q., & Hacıyev, Z. (2001). *Sosial fəlsəfə.* Bakı: Ayna mətbuat evi, 505s.
2. Соловьева, Г. Г. (2012). *Современная западная философия (компаративистские исследования)*. Монография в 2-х т. (Под. общ.

ред. Шаукеновой, З. К. 2-е изд. перераб. и дополн. Т. 1). Алматы: ИФПР КН МОН РК, 316 с. ISBN: 678-601-7082-58-1

**3.** Martin, T. F. (2003). *Our Restless Heart: The Augustinian Tradition.* New York, Maryknoll: Orbis Books, 172 p. ISBN-13: 978-1570754746

**4.** Grant, P. (1996). *Personalism and the Politics of Culture: Readings in Literature and Religion from the New Testament to the Poetry of Northern Ireland.* London: Palgrave Macmillan, 211 p. ISBN-13: 978-0333614228

**5.** Журавлев, О. В. (1998) *История современной зарубежной философии: Компаративистский подход.* (1 т. 3-е издание, расширенное). Санкт-Петербург: Издательство «Лань», 448 с. ISBN: 5-8114-0073-X

**6.** Вдовина, И. С. (1990). *Французский персонализм (1932-1982).* Москва: Высшая школа, 151 с. ISBN: 5-06-001597-1

**7.** Мунье, Э. (1994). *Что такое персонализм?* (Перевод с французского, примеч. Вдовиной, И. С.). Москва: Издательство гуманитарной литературы, 128 с. ISBN: 5-87121-004-х

**8.** Кузнецов, В. Н. (1970). *Французская буржуазная философия XX века.* Москва: Мысль, 318 с.

## Философский анализ западноевропейского персонализма

**Руслан Халилов***

**Абстракт.** Среди задач, привлекающих внимание философов-мыслителей, особое место занимает индивидуализм, в особенности персонализм. При определении данной проблемы, отражающей отношения человека с обществом, со своеобразными особенностями, свободой и неповторимостью, для достижения полных и всесторонних заключений, следовало бы изначально основываться на показатели конкретной личности. Воплощение указанной задачи в жизнь, не так-то просто. Потому что речь идет об обучении процесса, начинающего с различия определенной личности от других, и продолжающего определением формирования его уникальности и существования. Человек, появляется на свет как индивид, но благодаря своей деятельности, самосознанию может стать существом, отражающим

* Докторант специальности «История философии» Хазарского университета,
Преподаватель Хазарского университета; Баку, Азербайджан
E-mail: ruslan.khalilov@khazar.org
https://orcid.org/0009-0007-5394-0740

**Цитировать статью:** Халилов, Р. [2023]. Философский анализ западноевропейского персонализма. *Журнал «Metafizika», 6(4),* с.206-215.

**История статьи:**
*Статья поступила в редакцию: 27.11.2023*
*Отправлена на доработку: 04.12.2023*
*Принята для печати: 11.12.2023*

личность. Для нормального функционирования и развития общества, каждому из его членов необходимо определенное своеобразие. Подлинное богатство каждой социальной структуры и ее культуры определяет разнообразие членов общества, существование ярко выраженных индивидов и личностей. Поэтому обладание людей личным своеобразием воспринимается как закономерность социального развития. В статье подобные процессы исследованы, основываясь на высказывания европейских персоналистов.

**Ключевые слова:** человек, цивилизация, индивидуализм, персонализм, Мюнье, европейский персонализм

## Philosophical analysis of the western European personalism

**Ruslan Khalilov***

**Abstract.** The problems of individualism and especially personalism have always been one of those issues that have always attracted the attention of philosophical thought. This means that a person preserves his characteristics, originality and uniqueness in his relations with society. First of all, if we talk about the importance of identifying this problem, then, in essence, this is the study of its holistic and comprehensive nature, based on indicators that are characteristic of a particular person. It is not so easy to complete this task. Because we are talking about learning a process that begins with distinguishing a certain person from others and continues to form his uniqueness and define his existence. A person who comes into the world as an individual can become a being capable of activity, self-awareness and personality. Particularly, for the normal functioning and development of society each of its members needs a certain amount of uniqueness. And the diversity of members of society, the existence of distinct personalities ensures the true richness of each social structure and its culture. Therefore, the fact that people have individual uniqueness is also accepted as a pattern of social development.

And we will be able to follow these processes in the ideas of the European personalists that we will talk about.

**Keywords:** Human and civilization, individualism, personalism, Munye and European personalism

* Doctoral student of "History of Philosophy" specialty of Khazar University,
Lecturer at Khazar University; Baku Azerbaijan
E-mail: ruslan.khalilov@khazar.org
https://orcid.org/0009-0007-5394-0740

**To cite this article:** Khalilov, R. [2023]. Philosophical analysis of the western European personalism. *"Metafizika" journal*, *6(4)*, pp.206-215.

**Article history:**
*Received: 27.11.2023*
*Accepted: 11.12.2023*

## REFERENCES

**1.** Abbasova, G., & Hajiyev, Z. (2001). *Social philosophy*. Baku: Ayna Press House, 505p. (in Azerbaijani)
**2.** Solovyova, G. G. (2012). *Contemporary Western Philosophy (Comparative Studies).* Monograph in 2 volumes (Under the general editorship of Shaukenova, Z.K. 2nd ed. revised and supplemented. T. 1). Almaty: IFPR KN MES RK, 316 p. ISBN: 678-601-7082-58-1 (in Russian)
**3.** Martin, T. F. (2003). *Our Restless Heart: The Augustinian Tradition.* New York, Maryknoll: Orbis Books, 172 p. ISBN-13: 978-1570754746 (in English)
**4.** Grant, P. (1996). *Personalism and the Politics of Culture: Readings in Literature and Religion from the New Testament to the Poetry of Northern Ireland.* London: Palgrave Macmillan, 211 p. ISBN-13: 978-0333614228 (in English)
**5.** Zhuravlev, O. V. (1998) *History of modern foreign philosophy: Comparative approach.* (1 volume, 3rd edition, expanded). St. Petersburg: Lan Publishing House, 448 p. ISBN: 5-8114-0073-X (in Russian)
**6.** Vdovina, I. S. (1990). *French personalism (1932-1982).* Moscow: Higher School, 151 p. ISBN: 5-06-001597-1 (in Russian)
**7.** Mounier, E. (1994). *What is personalism?* (Translation from French, note by Vdovina, I.S.). Moscow: Publishing House of Humanitarian Literature, 128 p. ISBN: 5-87121-004-x (in Russian)
**8.** Kuznetsov, V. N. (1970). *French bourgeois philosophy of the 20th century.* Moscow: Mysl, 318 p. (in Russian)